# AİLƏ

## ANALARIN BAYRAMI

Analar bayramıdır,
Gəlib martın səkkizi.
Əziz analar, hamı
Təbrik eləyir sizi.




Nəçi olursa-olsun,
Ana daim anadır.
Sənət, şöhrət bir yana,
Analar bir yanadır.

Mərd övladlar yetirən
Mərd analar var olsun!
Yer üzündə analar
Daim bəxtiyar olsun!

*Mikayıl Rzaquluzadə*

1. Ana nə üçün müqəddəs, əzizdir?
2. Siz ananızı nə üçün sevirsiniz?



# ATAM

Atam evə gələndə
Elə bil ki, nur saçır.
Anamın çöhrəsində
Təbəssüm çiçək açır.

Gülür qardaşım, bacım,
Sevinir babam, nənəm.
Atam işdən gələndə
Ən çox sevinən mənəm.

Mehribandır hamıya,
Çoxdur ona hörmətim.
Çiynimə əl qoyanda
Artır gücüm, qüdrətim.

Atam ciddi olsa da,
Ürəyi çox kövrəkdir.
Hava kimi, su kimi
Hamımıza gərəkdir.





Atana hörmət elə, oğlun da sənə hörmət edər.
Ata haqqı unudulmaz.
Ata gözdür, oğul gözün işığı.



Atanın ailədə qayğısını nədə görürsünüz?

# BABAM

Tez-tez gedirəm
Babamgilə mən.
Elə ki mənim
Tutur əlimdən,
Çəlikçiz gəzir,
Sevinir o gün.
Deyir ki, bala,
Çəlik kimisən
Sən baba üçün...

*Vaqif İbrahim*





Böyüksüz yerdə xeyir-bərəkət olmaz.

Baba nə üçün nəvəsini çəliyə bənzədir?



# CAN NƏNƏ

Qucağında, nənə, sən
Layla dedin mənə sən.
Mənim mehriban nənəm,
Əziz nənəm, can nənəm.

Böyümüşəm, nənə, mən
Qoy tutum əllərindən.
Mənim mehriban nənəm,
Əziz nənəm, can nənəm.

*Teymur Elçin*





Anaların anası — evimizin sonası.



Nə üçün nənəmizi sevirik?

# TAXTA BOŞQAB



Baba o qədər qocalmışdı ki, əli əsirdi. Bir dəfə yemək yeyəndə boşqab onun əlindən düşüb sındı.

Gəlin deyindi:

— Gərək bu kişi üçün taxtadan boşqab, qaşıq düzəltdirək.

Nəvə bu sözləri eşitdi. O, həyətdən taxta gətirib yonmağa başladı. Anası ondan soruşdu:

— Oğlum, nə düzəltmək istəyirsən?

— Ana, taxtadan boşqab, qaşıq düzəltmək istəyirəm ki, atamla sən qocalanda sizə onlarda yemək verim.

Gəlin öz səhvini başa düşdü.



1. Nə üçün böyüklərə hörmət etmək lazımdır?
2. Gəlinin səhvi nədə idi?

Böyüyünə hörmət etməyənə heç kəs hörmət etməz.
Bərəkət harda var? - Böyüklü yerdə.



# BÖYÜKLƏRƏ HÖRMƏT ET

Sən can yandır anana,
Sənə candan yanana.
Sev atanı könüldən,
Qulluq elə ona sən.

Hörmət etmək nənənə
Qoy bir borc olsun sənə.
Eşit baba sözünü,
Sevdir ona özünü.

Bir yıxılan görəndə
Tut əlindən, balacan.
Yaxşı işlər görməyə
Çalışmalıdır insan.

*Mirvarid Dilbazi*



Hörmət hörmətə bağlıdır.
Kiçiklərə hörmət et, böyüklərdən hörmət qazan.



# QUQU QUŞU

(Əfsanə)



Ananın dörd uşağı var imiş. Günlərin bir günü ana bərk xəstələnir, qızdırma içində yanır. O, böyük oğlunu çağırır ki, gəlib ona su versin. Uşaq oynamağa tələsdiyindən anasına su vermir. Bunu görən ana bərk təəssüflənir. O biri övladları da anaya su vermirlər. Hiddətlənən ana arzu edir ki, bir quşa çevrilsin.

Ana öz arzusuna çatır. O, quş olub uçur. Uşaqlar ağlaya-ağlaya analarının dalınca qaçırlar. Ancaq sonrakı peşmançılıq fayda verməz.

Deyirlər ki, övladlarından etibar görməyən Ququ quşu elə buna görə də yuva qurub bala çıxarmır. O, özgə quşların yuvasında yumurtlayır. Onun balalarını özgə quşlar bəsləyib böyüdürlər.



1. Ana nə üçün quş olmaq istədi?
2. Uşaqlar nədən peşman oldular?
3. Nəyə görə ququ quşu özgə quşların yuvasında yumurtlayır?



# ÖRDƏK BALASI

Ördək yatmışdı. Birdən onun altındakı yumurtalardan biri içəridən döyüldü:

— Tıq-tıq! Tıq-tıq!

Ana ördək soruşdu:

— Kimdi yumurtanı döyən?

— Mənəm, ördək balasıyam. Bayıra çıxmaq istəyirəm.

— Onda yumurtanın qabığını bərk dimdiklə və özünə yol açıb bayıra çıx!

Ördək balası yumurtadan çıxdı və sevinə-sevinə dedi:

— Salam, ana! Salam, günəş!

*Tofiq Ağayev*





1. Suda üzə bilən ev quşları hansıdır?
2. Quşlar necə bala çıxarırlar?

# MƏNƏVİ DƏYƏRLƏRİMİZ

## YAXŞI DOSTUN TƏSİRİ

Bir gün gəzərkən ayağımın altında yarı qurumuş bir yarpaq gördüm. Onu əlimə aldım. O qədər gözəl, ürəkaçan ətri var idi ki...

Heyrətlə ondan soruşdum:

— Sən gülmüsən, çiçəkmisən? Bu qədər gözəl ətir səndə hardandır?

Yarpaq dilə gəlib dedi:

— Xeyr, mən gül deyiləm. Ancaq bir müddət gül yarpağı ilə dostluq eləmişəm.

*Sədi Şirazi*





Dostunu mənə göstər, deyim sən kimsən.
Dostluq düzlükdədir.



Kimə dost demək olar?

# İKİ YOLDAŞ

İki yoldaş meşədə gəzirdi. Birdən onların qarşısına bir ayı çıxdı. Uşaqlardan biri tez ağaca dırmaşdı. O birisi isə qaça bilmədi. Yerə uzanıb özünü ölülüyə vurdu.

Ayı uşağa yaxınlaşıb onu iylədi. Oğlanı ölmüş bilib getdi.

Ayı gedəndən sonra ağacdakı uşaq yerə düşüb gülə-gülə dostundan soruşdu:

— Ayı sənə nə dedi?

Oğlan belə cavab verdi:

— Ayı mənə dedi ki, dost dostunu darda qoyub qaçmaz.

*Lev Tolstoy*





Dost dostu dar gündə tanıyar.
Ən böyük dövlət dostluqdur.



Dar gün nədir?

# BÜLBÜL VƏ QIZILQUŞ



Baharın gözəl bir çağında Bülbül üzünü Qızılquşa tutub dedi:

— Ey Qızılquş, sən dünyaya gələndən bir nəğmə oxumamısan. Bəs necə olur ki, şah səni bu qədər çox istəyir? Yediyin kəklik ətidir. Mənim xörəyim isə cücü-mücü, qurd-quşdur. Sən gözəl sarayda yaşayırsan, mənim yerim isə kol-kosdur.

Qızılquş dedi:

— Ey Bülbül, mənim sözlərimə yaxşı-yaxşı qulaq as. Mən gündə yüz iş görsəm də, bu haqda heç kəsə xəbər vermirəm. Sən isə bir gördüyünü yüz yerə car çəkirsən. Elə buna görə də mənim qonduğum yer şah əlinin üstü, sənin məskənin isə qaratikanlıqdır.

*Nizami Gəncəvi*



1. Bülbül Qızılquşa nə dedi?
2. Qızılquş Bülbülə nə cavab verdi?
3. Nağıldan hansı nəticəni çıxarmaq olar?

# KƏRPİCKƏSƏN KİŞİ

Şam şəhərində zəhmətkeş bir qoca yaşayırdı. O, hər gün kərpic kəsib satır, çörəkpulu qazanırdı.

Bir dəfə bir cavan oğlan ona yaxınlaşıb dedi:

— Ay kişi, kərpic kəsmək qoca işi deyil. Bu ağır işdən əl çək. Axı kim səndən bir qarın çörək pulunu əsirgəyər?



Qoca dedi:

— Oğul, əlimi bu sənətə ona görə öyrətmişəm ki, heç kəsə əl açıb dilənməyim.

Cavan öz səhvini başa düşüb, qocadan üzr istədi.

*Nizami Gəncəvi*

1. Cavan oğlan kərpickəsən kişiyə nə dedi?
2. Qoca oğlana nə cavab verdi?
3. Sizcə, kim haqlıdır: kərpickəsən kişi, yoxsa cavan oğlan?



# ANANIN SÖZLƏRİ

Anasının yanına
Qaçdı balaca Qəşəm.
Dedi: — Ana, ay ana,
Gözəl güllər dərmişəm.
Bundan bağban əminin
Heç olmayıb xəbəri.
Gizlin dərib gətirdim
Mən sənə bu gülləri.
Ana söylədi: — Oğlum,
Çox məyus etdin məni.
Analar sevməyirlər
Oğurluq hədiyyəni...

*Tofiq Mütəllibov*





1. Ana nə üçün gülləri görəndə əsəbiləşdi?
2. O, Qəşəmə nə dedi?

# «SAĞ OL» DEDİ

Əsdi külək, yağdı yağış,
Çay buluda «sağ ol» dedi.
Pırr eləyib uçdu göyə,
Quş qanada «sağ ol» dedi.
Yolçu yola kölgə salan
Bir palıda «sağ ol» dedi.
Yandı ocaq, getdi soyuq,
İnsan oda «sağ ol» dedi.
Söylə görüm, bəs sənə kim
Bu dünyada «sağ ol» dedi?

*Məstan Günər*





1. Nə üçün çay buluda, quş qanada, insan oda "sağ ol" dedi?
2. "Sağ ol" sözünü eşitmək üçün hansı işləri görmək lazımdır?



## QADIN VƏ TOYUQ



Toyuq hər gün yumurtlayırdı. Onun sahibi fikirləşdi ki, əgər toyuğun dənini artırsa, gündə iki-üç dəfə yumurtlayar.

Belə də etdi. Ancaq toyuq kökəlib yağlandığı üçün yumurtadan kəsildi.

*Lev Tolstoy*



Qadın nə üçün toyuğun dənini artırdı?



Çox yemək, azdan qoyar.

## CIRCIRAMA VƏ QARIŞQA

Acmış cırcırama qarışqadan yeməyə bir şey istədi.

Qarışqa təəccübləndi:

— Bəs sən yayda özünə bir şey toplamamısan?



Cırcırama zarıya-zarıya dedi:

— Vaxtım yox idi. Mən ancaq mahnı oxuyurdum.

Qarışqa acı-acı güldü:

— Yayda işləməyən, qışda dişləməz.

*Lev Tolstoy*



1. Cırcırama qarışqadan nə istədi?
2. Qarışqa ona nə cavab verdi?

# FİL TƏRBİYƏSİ

Qocalmış bir canavar son nəfəsində balalarını başına yığdı. Onlara belə vəsiyyət elədi:

— Qarşınıza qoyun-quzu çıxan kimi parçalayın!

Ayı öz balalarına belə nəsihət elədi:

— Arı pətəklərindən bal yeyin. Sonra qış yuxusuna gedin.

Tülkü balalarını çağırdı və onlara tapşırdı:

— Balalarım, ömrünüzü hiylə ilə keçirin. Kim yaşamaq istəyirsə, onun yüz üzü olmalıdır. Aslana, pələngə baş əyin .Toyuq-cücəyə aman verməyin. Hər işdə mənə oxşayın.



Fil belə etmədi:

— Balalarım, pələngdən cürətli, qartaldan vüqarlı olmağı öyrənin. Bal arısı kimi həmişə düzlük axtarın. Qarışqa kimi zəhmətkeş olun...—dedi.

Körpə fillər fil tərbiyəsi ilə böyüdülər, boya-başa çatdılar. Buna görə filin balası da fil oldu.

*Hikmət Ziya*

1. Canavar öz balalarına nəyi vəsiyyət etdi?
2. Ayı balalarına nə dedi?
3. Tülkünün tapşırığı necə idi?
4. Bəs fil öz balalarını necə tərbiyə elədi?



# SEL VƏ CAMIŞ

Bir kişinin bir camışı var idi. Hər gün onu sağır, südünü satıb ailəsini dolandırırdı. Bir gün sel camışı apardı. Kişi başına-döşünə döyüb ağladı, fəğan qopardı. Oğlu ona belə dedi:

— Ata, ağlama, bu sənin öz günahının cəzasıdır. Hər gün camışın südünə su qatıb satırdın. Su o qədər yığıldı, yığıldı, axırda selə dönüb camışını apardı.

*Mirzə Ələkbər Sabir*





1. Kişi nəyə görə ağlayırdı?
2. Oğlu atasına nə dedi?

Nə tökərsən aşına,
o da çıxar qaşığına.



Bir damcı haram
bir dərya halalı heç eləyər.

# HİYLƏGƏR KEÇİ

(Nağıl)

El dağdan qayıdanda bir Keçi, bir Dana, bir Qoyun köçdən geri qaldılar. Onların canına qorxu düşdü. Dana bir ayı dərisi, Keçi bir qurd dərisi, Qoyun da bir çaqqal dərisi tapıb büründülər və özlərinə bir daxma axtarmağa getdilər. İçəri girəndə gördülər ki, orada bir Ayı, bir Qurd və bir Çaqqal var. Hiyləgər keçi yoldaşlarına dedi:

— Bir Qurd yeyib dərisinə bürünmüşəm, birinə də indi rast gəldim.

Dana dilləndi:

— Bir Ayı yeyib dərisinə bürünmüşəm, birini də indi yeyərəm.

Qoyun dedi:

— Bir Çaqqal yeyib dərisinə bürünmüşəm, birini də burada tapdım.

Bu sözü eşidən kimi Çaqqal götürüldü.



Onun dalınca Qurd qaçdı. Ayı da onlara baxıb uzaqlaşdı. Onlar qaçandan sonra Keçi yoldaşlarına dedi:

— Gəlin biz də qaçaq. Yoxsa vəhşilər gəlib bizi yeyəcəklər.

Ev heyvanları qaçıb köçə qoşuldular.

1. Köçdən ayrı düşdüklərini bilən heyvanlar nə etdilər?
2. Vəhşi heyvanlar keçinin sözündən niyə qorxdular?



## DOVŞAN VƏ TISBAĞA

Dovşan Tısbağaya güldü. Onu lağa qoyub dedi:

—Ay Tısbağa lələ, bəlkə mənimlə qaçış yarışına girəsən?

Heyvanlar pıqqıldaşıb güldülər. Tısbağa isə özünü sındırmadı. O saat cavab verdi:

— Razıyam. Ancaq bir şərtim var.

— Buyur görək.

— Hünərin çatırsa, quruda yox, suda yarışaq.

Dovşan pərt oldu və səssiz-səmirsiz çıxıb getdi.






1. Dovşan Tısbağanı niyə lağa qoydu?
2. Tısbağa Dovşana nə dedi?
3. Dovşan niyə pərt oldu?

# TIQ –TIQ XANIM

*(Abdulla Şaiqin əsəri əsasında)*

Biri vardı, biri yoxdu, bir Tıq-Tıq xanım vardı. Bir gün o, qərara gəldi ki, özünə dost axtarsın. Bəzəndi-düzəndi və yola düzəldi. Az getdi, üz getdi, dərə-təpə düz getdi, bir çobanla rastlaşdı. Çoban ondan soruşdu:

– Ay Tıq-Tıq xanım, nə qəşəng bəzənmisən, hara belə?

– Çərə gedirəm, çurə gedirəm, sənə nə var hara gedirəm?! Özümə dost axtarıram.

Çoban dedi:

– Gəl mənimlə dost olaq.



Tıq-Tıq xanım soruşdu:
— Səni hirsləndirsəm, məni nə ilə döyərsən?
Çoban dedi:
— Bax, bu çomağımla!
Tıq-Tıq xanım dedi:
— Get, get, səndən mənə dost olmaz!
Tıq-Tıq xanım çobandan uzaqlaşıb oxuya-oxuya yola düzəldi. O, bir Siçana rast gəldi.
Siçan soruşdu:
— Tıq-Tıq xanım, hara belə?
Tıq-Tıq xanım cavab verdi:
— Çərə gedirəm, çürə gedirəm, sənə nə var hara gedirəm?! Özümə dost axtarıram.
Siçan dedi:
— Gəl mənimlə dost olaq.
Tıq-Tıq xanım soruşdu:
— İşdir, səni hirsləndirsəm, məni nə ilə döyərsən?
Siçan dedi:
— Heç sənin kimi gözəli döymək olar?
Quyruğuma yağ, telinə sığal çəkərəm.
Bu sözlər Tıq-Tıq xanımın xoşuna gəldi. Siçanla Tıq-Tıq xanım dostlaşdılar. Bir gün Siçan Tıq-Tıq xanıma dedi:
— Xan evində toydur. Orada ləzzətli yeməklər olacaq. Gedim sənə də gətirimmi?
Tıq-Tıq xanım razılaşdı.
Siçan bəy xan evinə yollandı. Tıq-Tıq xanım isə Siçanın paltarlarını yumağa aparanda sürüşüb gölə düşdü. Nə qədər çalışdısa, çıxa bilmədi.
Bu anda gölün yanından atlılar keçirdi. Tıq-Tıq xanım üzünü onlara tutub çığıra-çığıra dedi:
— Ehey, atlılar, xan evinə gedin, Siçan bəyə deyin,

Tıq-Tıq xanım gölə düşüb boğulur. Tez gəlsin xilas etsin.

Atlılar xan evinə yetişib, əhvalatı toya gələnlərə söylədilər. Siçan bunu eşidib özünü gölə yetirdi. Suda boğulan Tıq-Tıq xanıma əl uzadıb dedi:

— Əlini mənə, bəsdərəcik.

Tıq-Tıq xanım əsəbi halda dedi:

— Get, mən səndən küsdərəcik.

Siçan üç dəfə əl uzatdı, Tıq-Tıq xanım da eyni cavabı verdi. Axırda Siçan bərk qəzəbləndi, bir parça palçığı götürüb Tıq-Tıq xanımın başına çırpdı və çıxıb getdi.





Dost dosta tən gərək,
Tən olmasa, gen gərək.

Dostu qazanmaq üçün nə etmək lazımdır?



# MARAL VƏ TƏNƏK

Maral ovçudan qaçıb üzüm tənəklərinin arasında gizləndi. Bir azdan sonra o, tənəyin yarpaqlarını yeməyə başladı. Ovçu yarpaqların tərpəndiyini hiss edib, maralı güllə ilə vurdu.

Yaralı maral ölərkən dedi:

— Elə yaxşı oldu. Məni ovçudan qoruyan yarpaqları yediyim üçün məni vurdular.

*Lev Tolstoy*





1. Maral nə üçün özünü günahlandırdı?
2. Bu kiçik nağıldan necə nəticə çıxarmaq olar?

# QIZIL QƏFƏS

(Nağıl)

Şah sarayının qarşısındakı bağçada bir bülbül oxuyurdu. O, mahnısını bitirəndən sonra uçub gedirdi. Bülbülün bu hərəkəti şahın xoşuna gəlmədi. Əmr etdi ki, onu tutub qəfəsə salsınlar.

Bülbül qəfəsə düşəndən sonra daha oxumadı. Şah qəzəblənib ondan soruşdu:

— Ey bülbül, nə üçün oxumursan?

— Bəs sən nə üçün məni qəfəsə salmısan?

— Qorxuram ki, səni pişik yesin.

— Onda nə üçün pişiyi yox, məni qəfəsə salırsan?

Şah bülbülün sözlərindən heyrətləndi və onu açıb azadlığa buraxdı.



1. Nəyə görə şahın bülbülə acığı tutdu?
2. Bülbül qəfəsdə niyə oxumadı?
3. Necə oldu ki, şah bülbülü azadlığa buraxdı?



# HİKMƏT XƏZİNƏSİNDƏN

## MƏHƏMMƏD PEYĞƏMBƏRİN KƏLAMLARINDAN

- Cənnət anaların ayaqları altındadır.
- Ataya itaət Allaha itaət, ataya üsyan Allaha qarşı üsyan deməkdir.
- Heç bir ata övladına gözəl tərbiyədən qiymətli hədiyyə verə bilməz.
- Elmi beşikdən qəbrədək öyrənin.
- Ən xeyirli sədəqə odur ki, bir müsəlman elm öyrənə və sonra onu öz müsəlman qardaşına öyrədə.
- Gözəl əxlaq dinin yarısıdır.
- Vətəni sevmək imandandır.



## RAMAZAN BAYRAMI

On bir ayın soltanı
Ramazanım xoş gəlib.
Gözəl günlər yaşamaq
Bəxtimizə tuş gəlib.

Ulu Tanrım, çin olsun
Arzumuz, niyyətimiz.
Bizi xoşbəxt eləsin
Ülvi məhəbbətimiz.

İnsana yaraşarmı
Tamahına qul olsun?
Qəlbi saf olanların
Orucu qəbul olsun!



Nə üçün Ramazan ayına "on bir ayın sultanı" deyirlər?

## QURBAN BAYRAMI

Allah yolunda xərclə
Dövlətini, malını.
Ürəyindəki iman
Nurlandırar yolunu.

Mərhəmətlidir Tanrım,
Günahlardan keçəndir.
O, yaxşıları pisdən
Arayandır, seçəndir.

Yaradan qəlbimizə
İlahi nur ələsin.
Verdiyiniz qurbanı
Allah qəbul eləsin!





Qurban bayramı haqqında nə bilirsiniz?

# TƏBİƏTİ SEVƏK VƏ QORUYAQ

## YURDUMUZUN TƏBİƏTİ

Azərbaycanın təbiəti çox zəngindir. Onun başı qarlı dağları göz oxşayır. Şahdağ, Babadağ, Kəpəz, Murov, Qoşqar öz əzəməti ilə adamı heyran qoyur. Dağlardan dərələrə tökülən şəlalələr, hər daşın dibindən qaynayan buz bulaqlar bir-birinə qoşularaq çaylar əmələ gətirir. Arpa çayı, Oxçu çay, Bərgüşad, Həkəri Araza tökülür. Araz Kürə, Kür isə Xəzər dənizinə axır.

Göygöl, Maralgöl, Ağgöl, Qaragöl yurdumuzun təbiətinə yaraşıq verir.

Azərbaycanın Mil, Muğan, Şirvan kimi geniş düzləri, bərəkətli əkin sahələri vardır.

Yurdumuzda çoxlu dövlət qoruqları yaradılmışdır. Bu qoruqlarda nadir bitkilər, ağaclar, heyvanlar, quşlar qorunur. Vətənin təbiətini qorumaq hamımızın borcudur.





1. Azərbaycanda hansı dağlar var?
2. Çaylarımızın adını saya bilərsinizmi?
3. Yurdumuzdakı ən böyük çay hansıdır?
4. Qoruqlar nəyə görə yaradılıb?



# MİLLİ SƏRVƏTİMİZ

Ölkəmizdə zəngin neft yataqları var. Həm qurudan, həm də dənizdən neft çıxarılır. Xəzər dənizində Neft daşları kimi əfsanəvi bir şəhər salınıb. Təsadüfi deyil ki, neftə «qara qızıl» da deyirlər.

Daşkəsəndə qiymətli dəmir filizi çıxarılır. Kəlbəcərdə zəngin qızıl yataqları var. Naftalanın, İstisuyun müalicə əhəmiyyəti böyükdür. Torpağımızın altı da, üstü də xəzinədir. Muğan, Mil düzlərində pambıq əkilir. Pambığa el arasında «ağ qızıl» deyirlər. Bərəkətli taxıl zəmilərimiz göz oxşayır. Meşələrimizdə qiymətli ağaclar, faydalı dərman bitkiləri bitir. Bunların hamısı bizim sərvətimizdir.



1. Azərbaycanın qiymətli sərvətləri hansılardır?
2. Nə üçün neftə «qara qızıl», pambığa «ağ qızıl» deyirlər?
3. Torpağımızda daha nə əkilib-becərilir?

# SU

Möcüzələr yaradır
Həyatda hər damla su.
Çiçək olub açılır
Yağışın hər damlası.

Su olmasa quruyar
Kollar, güllər, ağaclar.
Gün altında qovrular
Çiçəklənən yamaclar.

Bir həyat çeşməsidir
Çaylar, göllər, bulaqlar.
Su olmasa neyləyər
Balinalar, balıqlar?



Susuz qəribsəyərdi
Meşələr, dağlar, düzlər.
Dünyamıza bəzəkdir
Okeanlar, dənizlər...



1. Biz harada suya rast gəlirik?
2. Suyun faydası nədir?
3. İnsanlar sudan nə məqsədlə istifadə edirlər?



Su həyat mənbəyidir.
Su axıb çuxurunu tapar.

# TƏBİƏTİN İŞİ



Anar kəndə getmişdi. O, bağda uzanıb quşların nəğməsinə qulaq asır və düşünürdü:

— Təbiətin işindən baş aça bilmirəm. Balaca alma, armud böyük, hündür ağacdan, balqabaq, qarpız və yemiş isə nazik tağlardan asıla qalıb?

Elə bu vaxt yel əsdi və bir alma budaqdan qopub düz Anarın başına düşdü. Anar ufuldadı və dedi:

— Hə, indi hər şeyi başa düşdüm. Nə yaxşı ki, qarpız, yemiş və balqabaq ağacda bitmir. Təbiət öz işini yaxşı bilir.



1. Anar nə düşünürdü?
2. Anar öz səhvini nə zaman başa düşdü?

# AĞAC BOŞ QAYTARMADI

Ağacın dibindəki
Torpağa bax, çat-çatdı.
Nə yaxşı ki, tez gördüm,
Onun hayına çatdım.

Bir vedrə su apardım,
Tökdüm, ləzzətlə içdi.
Budağından almalar
Qopub vedrəmə düşdü.



Necə gözəldir ətri,
Necə əladır dadı.
Pay apardığım qabı
Ağac boş qaytarmadı...

1. Nə üçün ağacı sulamaq lazımdır?
2. Ağac oğlanın zəhmətini necə qiymətləndirdi?



# EV QUŞLARININ FAYDASI

Qədim insanlar quşları ovlayırdılar. İllər keçdikcə onlar bəzi quşları əhliləşdirə bildilər. İnsanlar toyuq-cücə, qaz, ördək saxlamağa başladılar. Quşlara dən verib bəslədilər, onlar üçün qalmağa yer – hin tikdilər. Onların ətindən, yumurtasından çox faydalı qida məhsulu kimi istifadə etdilər. Tükündən isə yumşaq yastıqlar hazırladılar.

İnsanlar indiyə qədər də ev quşlarından faydalanırlar.



1. Hansı ev quşlarını tanıyırsınız?
2. Ev quşlarının faydası nədir?



# EV HEYVANLARININ FAYDASI

Ta qədimdən insanlar heyvanları əhliləşdirib onlardan faydalanmışlar.

İnək, camış, qoyun, keçi saxlayan babalarımız, nənələrimiz onların südündən, qaymağından, qatığından, yağından, ayranından, şorundan, eləcə də ətindən, dərisindən istifadə etmişlər. At, eşşək, qatır və dəvə minik, yük daşımaq vasitəsi olmuşdur. İt həyət-bacanın, pişik isə evin keşikçisinə çevrilmişdir.

İnsanlar bu heyvanlara mahnılar həsr etmiş, onlar haqqında şeirlər, nağıllar, hekayələr yazmışlar.



1. İnsanlar nəyə görə heyvan saxlayırlar?
2. Hansı ev heyvanlarını tanıyırsınız?
3. Ev heyvanlarının faydası nədir?



# KEÇİ

Ala-bula boz keçi,
Ay qoşabuynuz keçi.
Yalqız gəzib dolanma,
Dağa-daşa dırmanma.
Bir qurd çıxsa qarşına,
Sən nə edərsən ona?
Çoban açınca gözün,
Qalar iki buynuzun.

*Abdulla Şaiq*



1. Keçinin balası necə adlanır?
2. Keçinin insanlara faydası haqqında nə deyə bilərsiniz?



# DƏNİZ VƏ SAHİL

Dəniz dalğalandı:

— Mən yayı o biri fəsillərdən çox sevirəm.

Sahil ondan soruşdu:

— Nəyə görə?

Dəniz cavab verdi:

— Ona görə ki, yayda mənim görüşümə gələnlər çox olur. Adamlar sularıma baş vurub çiməndə, sərinləndə mən də sevinirəm. O biri fəsillərdə adamlar çıxıb gedirlər, mən isə tənha qalıram.



1. Dəniz sahilə nə dedi?
2. Sahilin sualına dəniz necə cavab verdi?



## YAYLAQDA

İnəklər otlayırdı
Yaylaqda şirin-şirin.
Onlara baxıb dedi
Bizim balaca Şirin:

— Ata, dağların otu
Nə üçün yumşaq olur?
İnək yaşıl ot yeyir,
Südü niyə ağ olur?





Körpü altında dörd bulaq.

## BALALAR

Camışın balası?
— Balaq.
Keçinin balası?
— Oğlaq.

Qoyunun balası?
— Quzu.
Ananın balası?
— Arzu...

1. Qulun hansı heyvanın balasıdır?
2. Bəs buzov nəyin balasıdır?
3. İtin balasının adı nədir?



# YUN

Qırxdım qoyunu,
Götürdüm yunu.
Aparıb verdim
Nənəmə onu.
Düzəltdi qəşəng
Yupyumşaq döşək.
Üstündə yatdım
Qırxdığım yunun.
Yuxumda gördüm
Qumral qoyunu.





1. Adamlar qoyundan nə məqsədlə istifadə edirlər?
2. Qoyunun yunundan nə hazırlanır?



Altı bulaq, içərlər.
Üstü zəmi, biçərlər.

# ATIM, GƏL!

Atım, gəl, ay atım, gəl!
Qolum, gəl, qanadım, gəl!
Yetir məni yaylağa,
Yalmanına yatım, gəl.

Atım, gəl, ay atım, gəl!
Şeirim, bayatım, gəl!
Ötür məni yaylağa,
Muradıma çatım, gəl.

Atım, gəl, ay atım, gəl!
Dincliyimi atım, gəl.
Gətir məni yaylağa,
Büllur şehə batım, gəl!



İnsanlar atdan necə istifadə edirlər?



# BALA CEYRAN

("Bir gəncin manifesti" romanından)

Bahar mal otarırdı. O, yoldaşlarını səslədi. Mürsəlin tulası hoppana-hoppana onun yanından üzüyuxarı getdi. Bahar kollardan tuta-tuta yuxarı qalxanda tulanın atılıb-düşdüyünü, bir ceyran balasının isə sakit dayanıb yazıq-yazıq baxdığını gördü. Uşaq sevindiyindən bilmədi nə eləsin. İrəli yeridi. Bildi ki, ceyran balası qaçmağa çalışacaq. O, ceyranın qabağını kəsdi. Ceyran yerindən sıçrayıb quş kimi qalxanda bir ayağı Baharın əlinə keçdi. Uşaq arxası üstə yıxılsa da, ceyranı buraxmadı. Ceyran lap körpə idi. Bahar onun zərif boynunu tumarlamağa başladı. Ceyran mələyirdi. Uzaqdan ona səs verdilər. Balasını səsləyən ana ceyranın səsi Baharın kiçik ürəyini kövrəltdi. O, pıçıltı ilə dedi:

—Arxayın ol, mən bala ceyranı bəsləyib böyüdəcəyəm...

*Mir Cəlal*





1. Bahar nəyə görə sevinirdi?
2. Siz Baharın yerinə olsaydınız nə edərdiniz?

## AĞACDƏLƏN



Mən ağacları
Əzizləyirəm.
Cücülərini
Təmizləyirəm.

Tanıyın məni:
Ağacdələnəm.
Kiçik olsam da,
Kara gələnəm...



1. Ağacdələnin faydası nədir?
2. Nəyə görə bu quşun adını ağacdələn qoyublar?

## QARĞA VƏ QRAFİN



Qarğa su içmək istəyirdi. O, bir qrafin tapdı. Ancaq su qabın dibində olduğundan içə bilmədi. Qarğanın dimdiyi suya çatmırdı. O, xırda daşlar yığıb qrafinə atmağa başladı. Su yavaş-yavaş yuxarı qalxdı. Qarğa doyunca su içdi və sonra uçub getdi.

1. Qarğa nə üçün qrafindən su içə bilmirdi?
2. Qarğa su içmək üçün nə etdi?



# TOYUQ VƏ QARANQUŞ

Toyuq bir ilan yumurtası tapdı. Onun üstündə kürt yatıb bala çıxartmaq istədi. Bunu görən qaranquş söylədi:

— Səfeh, sən bala çıxarıb onu böyüdəcəksən, o isə birinci səni çalacaq.

*Lev Tolstoy*





Ot kökü üstə bitər.



1. Toyuq nə istəyirdi?
2. Qaranquş onu niyə danladı?

# KİRPİ VƏ TÜLKÜ



Tülkü meşədə gəzirdi. O, Kirpiyə rast gəlib ondan soruşdu:

— Ay pinti, sən nə vaxt dəlləyə gedəcəksən?

Bu zaman kötüyün arxasından bir İlan sürünərək onlara yaxınlaşdı. Qorxudan Tülkünün ayaqları əsməyə başladı.



Kirpi birdən yumrulanıb İlana hücum etdi və onu öldürdü.

Tülkü sevinib Kirpiyə dedi:

— Mənim əzizim, sən heç vaxt dəlləyə getmə, belə də gözəlsən.

Yatanda yumru yatar,  
Ətinə dərman qatar.  
Kim onu tutmaq istəsə,  
Tikanı əlinə batar.





1. Tülkü Kirpiyə niyə lağ eləyirdi?
2. Kirpi Tülkünü İlandan necə xilas etdi?
3. Oxlar Kirpiyə nə üçün lazımdır?

## KƏPƏNƏK



Qaçma, dayan, kəpənək,
Bax bu gülə, çiçəyə.
Uçdu əlvan kəpənək
Qondu bu ağ çiçəyə.

Tutacaqdım onu mən
Birdən kəpənək uçdu.
Elə bil ki, əlimdən
Əlvan bir çiçək uçdu.

*Nəbi Xəzri*



Şair nə üçün kəpənəyi çiçəyə bənzədir?

## MƏN RƏNGLƏRİ TANIYIRAM

«Mən rəngləri tanıyıram» — deyir Elman.
Səma — mavi, yumurta — ağ.
Sapsarıdır — günəbaxan.
Qırmızıdır — gülöyşə nar.
Yarpaq — yaşıl,
kömür — qara,
dəniz — göydür.
Qızılıdır — boranılar.



*Zahid Xəlil*

Dünyamızı rənglərsiz təsəvvür etmək
mümkündürmü?



## ARILAR NƏ DEYİRLƏR



Yaz gəlmişdi. Bal arıları çiçəklərin üstündə vızıldaşırdılar. Rəna onlara maraqla tamaşa etdi və babasından arıların nə danışdığını soruşdu.

Baba nəvəsinin başını sığallayıb gülümsədi:

— Onlar deyirlər ki, çiçəklərin şirəsi bizim, ağacların meyvəsi sizin olsun.

O, havada uçsa belə,
Yoluna xalça döşəlidir.
Bir anadan yüz oğul,
Hamısı bir peşəlidir.



## ŞİRİN EV

Bal arısı ilə böcək dost oldular. Arı ona dedi:

— Sabah mənə qonaq gələrsən?

Böcək sevindi:

— Gələrəm, niyə gəlmirəm!

Arı soruşdu:

— Sən mənim evimi tapa bilərsən?

Böcək gülə-gülə dedi:

— Taparam, niyə tapmıram. Sənin evin dünyanın ən şirin evidir.



*Tofiq Ağayev*

Arıların yaşadığı "ev"in adı nədir?



# BİZ NƏLƏRİ ÖYRƏNDİK?

Məktəbə təzə gəldiyimiz günləri xatırlayaq. Onda hələ çox şeyi bilmirdik. Nə qələm tutmağı, nə oxumağı, nə də yazı yazmağı bacarırdıq.

Əvvəlcə şəkillər üzrə nağıl danışmağa başladıq. Sonra hərflərin tələffüz və yazılış qaydalarını öyrəndik. Bildik ki, danışıq səslərinin yazıda ifadəsi "hərf" adlanır. Hərflərdən heca, hecalardan söz, sözlərdən cümlələr qurmağı bacardıq. «Əlifba» əlimizdə sehrli bir açara döndü. Onun köməyi ilə özümüz sərbəst şəkildə oxumağa, yazmağa başladıq. Ana dilimizin gözəlliyi, şirinliyi bizi heyrətə gətirdi...

Əzbərlədiyimiz şeirlər, oxuduğumuz nağıllar, hekayələr bizə çox şey öyrətdi. İlin fəsilləri, yurdumuzun təbiəti, meşələri, dağları, çayları haqqında bilgilər aldıq. Heyvanlar, quşlar aləmi ilə tanış olduq. Vətənimizin tarixi keçmişini vərəqlədik. Qəhrəmanlarımızla tanış olduq. Başa düşdük ki, biz də vətənin adına layiq oğullar, qızlar kimi böyüməliyik. Öyrəndik ki, vətəndən gözəl, müqəddəs yer yoxdur. Azərbaycan gözəlliklər diyarıdır, onun sərvətləri çoxdur. Vətəni göz bəbəyi kimi qorumaq, onun keşiyində dayanmaq hər bir insanın borcudur.

Oxuduğumuz şeirlər, hekayələr bizi təmizliyə, saflığa, müqəddəsliyə, yalan danışmamağa, vətəni, onun təbiətini, ata-ananı sevməyə, ağsaqqallara, ağbirçəklərə hörmət etməyə səslədi. Öyrəndik ki, iş insanın cövhəridir, şərəfli əmək insanı ucaldır...

Biliklər ölkəsinə səyahətimiz isə davam edir. Hələ oxumalı, öyrənməli o qədər şeylər var ki...

Yolumuz uğurlu olsun!


VƏTƏNİMİZİN TARİXİNDƏN
AZƏRBAYCAN VƏTƏNİM MƏNİM
FƏSİLLƏR
MƏNƏVİ DƏYƏRLƏRİMİZ
AİLƏ
HİKMƏT XƏZİNƏSİNDƏN
ƏLİFBANI ÖYRƏNDİK
TƏBİƏTİ SEVƏK VƏ QORUYAQ
A B L F M C R Q O Ç G D N Ş S Ö Ğ T H X E U Ə P İ Ü J I V Y K Z

# MÜNDƏRİCAT

## HİKMƏT XƏZİNƏSİNDƏN



## TƏBİƏTİ SEVƏK VƏ QORUYAQ

Nizami Qulu oğlu Cəfərov
AMEA-nın müxbir üzvü, f.e.d., professor

Rafiq Yusifoğlu (Əliyev)
f.e.d., professor

Rəhilə Soltanqızı (Səfərəliyeva)

Eldar Abbas oğlu Əliyev
t.e.n., dosent

Zülfiyyə Altay qızı Veysova
p.e.n.

Aygün Əbülfət qızı Məcidova
p.e.n.

Sevda Mirzəmməd qızı Adıgözəlova

# Ana dili

(Əlifba, Oxu)

1-ci sinif üçün dərslik

Yenidən işlənmiş II nəşri

Rəssamlar:

*Respublikanın əməkdar rəssamı* Nüsrət Hacıyev
Ramil Əliyev
Nərmin Abdullayeva

| | |
|---|---|
| Nəşriyyatın direktoru: | E.A.Əliyev |
| Mətbəənin direktoru: | S.O.Mustafayev |
| Kompyuter dizayneri: | F.Z.Kərimov |
| Korrektor: | S.H.Sadıqova |

Çapa imzalanıb: 10.03.2010.
Formatı 57x80 1/8. F.ç.v. 19. Ş.ç.v. 17,67. Ş.r.o. 70,68.
Sayı 2000 nüsxə. Qiyməti 4 manat 50 qəpik.

«Çaşıoğlu» nəşriyyatı.
«Çaşıoğlu» mətbəəsi.
Bakı ş., Mikayıl Müşfiq küç., 2E.
Tel: 447-49-71.

